# Sünnənin İslamdakı yeri və təkcə Quranı götürüb Sünnəni tərk etməyin yolverilməz olmasının bəyanı

**Müəllif: Muhəmməd Nasir əd-din əl-Albani**

Ərəb dilindən tərcümə edən: Aydın Salehli

**Rəhimli və Mərhəmətli Allahın adı ilə**

# Müqəddimə

Həmd Allaha məxsusdur, Rəsulullaha, onun ailəsinə, səhabələrinə və ardıcıllarına Allahın salavatı və salamı olsun.

Bu mühazirəni mən hicrətin 1392-ci ilinin mübarək Ramazan ayında Qətərin paytaxtı Doha şəhərində vermişəm. Bəzi qardaşlar həmin mühazirənin faydalı olduğunu bildirərək bütün müsəlmanlar üçün faydalı olsun deyə məndən onu nəşr etməyimi xahiş etdilər. Mən də onların istəklərini nəzərə alaraq həmin mühazirəni nəşr etdim ki, möminlər üçün bir xatırlatma olsun. Mövzuya müəyyən başlıqlar əlavə etdim ki, oxucu onu yaxşıca qavraya bilsin. İzzət və Cəlal sahibi olan Allahdan diləyim odur ki, məni Öz dinini müdafiə edənlərdən, şəriətinə yardım edənlərdən etsin və onun savabını mənə yazsın. Şübhəsiz ki, O, ən Səxavətli olandır.

**Dəməşq şəhəri, Muhərrəm ayının 22-si, 1394-cü il.**

## Sünnənin İslamdakı yeri və təkcə Quranı götürüb Sünnəni tərk etməyin yolverilməz olmasının bəyanı

Həqiqətən şükür və tərif yalnız Allaha məxsusdur! Biz Ona həmd edirik, Onu köməyə çağırırıq, Ondan bağışlanma və bizi doğru yola yönəltməyi diləyirik, nəfslərimizin şərindən və pis əməllərimizdən qorunmaq üçün yalnız Ona pənah aparırıq. Allah kimə hidayət verərsə o, doğru yolda olar, kimi azdırarsa onu doğru yola yönəldən tapılmaz. Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə haqqı olan məbud yoxdur, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir.

**"Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!"**[1]

**"Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın *törədib yer üzünə* yayan Rəbbinizdən qorxun! Adı ilə birbirinizdən *cürbəcür şeylər* istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir".**[2]

**"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın ki, O, əməllərinizi islah etsin və günahlarınızı bağışlasın. Kim Allaha və Onun Elçisinə itaət etsə, böyük bir uğur qazanar".**[3]

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kitabı, hidayətlərin ən gözəli Muhəmmədin ﷺ hidayətidir, əməllərin ən pisi yeniliklərdir, hər bir yenilik bidət, hər bir bidət zəlalət, hər bir zəlalət isə Odda olacaqdır.

Güman etmirəm ki, bir sıra mötəbər alimlərin iştirak etdiyi bu məclisdə onlar üçün yeni olacaq məsələlərdən söhbət açım. Belə olduğu halda ümid edirəm ki, Uca Allahın: "**Sən xatırlat! Çünki**

---

[1] "Ali-İmran", surəsi, 102.
[2] "ən-Nisa", surəsi, 1.
[3] "əl-Əhzab", surəsi, 70-71.

**xatırlatmaq möminlərə fayda verir.”**[1] – ayəsində buyurulduğu kimi xatırladanlardan olaram.

Ramazan ayının bu mübarək gecəsində söhbət açacağım mövzu adətən əksər moizə söyləyənlərin söylədikləri mövzulardan fərqlənir. Belə ki adətən onlar oruc tutanlar üçün faydalı olan bu ayın fəzilətləri, əhkamları və ya bu ayda gecələri ibadətdə keçirməyin fəzilətləri barədə moizə söylədikləri halda mən başqa mühüm bir mövzu haqqında söhbət açacağam. Şəriətimizin əsaslarından hesab olunan bu mövzu İslam şəriətində Sünnənin əhəmiyyətidir.

* * * * *

[1] “əz-Zariyat”, 55.

## Quranla bərabər sünnənin vəzifəsi.

Bildiyiniz kimi, Uca Allah Muhəmmədi ﷺ peyğəmbərliklə seçərək ona Qurani Kərimi nazil etmişdir. Sonra da ona Quranı insanlara bəyan etməyi əmr etmişdir. Uca Allah buyurur: **“Sənə də Zikri nazil etdik ki, insanlara, onlara nazil olanı izah edəsən”**[1]
Beləliklə fikrimizcə bu ayədəki bəyan kəlməsi aşağıdakı iki növə şamil olunur:
**Birinci:** Uca Allahın peyğəmbərin ﷺ qəlbinə nazil etdiyi kimi Quranı təbliğ edib ləfzlərini anlatmaq, bunları gizlətməmək və ümmətə çatdırmaqdır. Uca Allahın aşağıdakı ayəsi də bu mənadadır: **“Ey Elçi! Rəbbindən sənə nazil ediləni təbliğ et!”**[2]
Aişədən ﵂ rəvayət olunan hədisdə o, belə demişdir: “Kimsə sizə desə ki, Muhəmməd ona təbliğ olunması əmr olunan məsələlərdən nəyisə gizlədib bilin ki, həmin şəxs Allaha iftira yaxır.” Sonra o yuxarıda qeyd olunan ayəni oxudu. Hədisi Buxari və Muslim rəvayət etmişdir. Muslimin rəvayətində isə deyilir: “Əgər Allahın rəsulu təbliğ etməyi əmr olunduğu məsələlərdən nəyisə gizlətmiş olsaydı heç şübhəsiz aşağıdakı ayəni gizlədərdi: **“Bir zaman Allahın nemət verdiyi və sənin özünün nemət verdiyin *Zeydə*: “Zövcəni öz yanında saxla, Allahdan qorx!”– deyirdin. Allahın aşkar edəcəyi şeyi ürəyində gizli saxlayır və insanlardan çəkinirdin. Halbuki əslində qorxmalı olduğun məhz Allahdır.”**[3]
**İkinci:** Qurandakı söz və cümlələrin bəyanı, habelə ümmətin açıqlamaya ehtiyac duyduğu ayələrin bəyanıdır ki, əksər hallarda buna icmali, ümumi və mütləq ayələrdə rast gəlinir. Bu cür hallarda Sünnə icmali ayələri aydınlaşdırır, ümumi ayələri xüsusiləşdirir və mütləq ayələri öz mənasına bağlayır ki, bu da peyğəmbərin ﷺ sözü, əməli, hətta razılığı ilə də ola bilər.

---
[1] “ən-Nəhl”, 44.
[2] “ əl-Maidə”, 67
[3] “əl-Əhzab, 37”

## Quranı anlamaq üçün Sünnəyə müraciət etməyin zəruriliyi və buna misallar.

Uca Allah buyurur: **"Etdikləri əməlin əvəzində Allahın cəzası olaraq oğru kişinin və oğru qadının əllərini kəsin!"**[1]

Bu ayə qeyd etdiyimiz mövzuya çox gözəl misaldır. Belə ki həmin ayədə oğru və əl sözləri mütləq olaraq qeyd olunmuşdur. Peyğəmbərin ﷺ Sünnəsi isə bu ayəni açıqlamış və dörddə-bir dinar miqdarından çox oğurluq edənə şamil olunduğunu bildirmişdir. Peyğəmbər demişdir: "Dörddə-bir dinar miqdarından az oğurluq edənin əli kəsilməz." Hədisi Buxari və Muslim rəvayət etmişdir. Həmçinin peyğəmbərin əməli və ya səhabələrin bunu etməsi, onun isə buna razılıq verməsi oğurluq etmiş şəxsin əlinin biləkdən kəsilməsinin lazım olduğunu bəyan etmişdir. Hədis kitablarında bu barədə bir çox dəlillər mövcuddur.

Başqa bir ayədə Uca Allah buyurur: **"Su tapmasanız, təmiz torpaqla təyəmmüm edin və ondan üzünüzə və əllərinizə sürtün."**[2]

Peyğəmbərin ﷺ Sünnəsi ayədəki əl kəlməsini də açıqlamış və onun yalnız ovucların içərisinə aid olduğunu bəyan etmişdir. Peyğəmbər ﷺ buyurmuşdur: "Təyəmmüm əllərin içərisinə və üzə torpaq sürtməkdir." Hədisi Əhməd, Buxari, Muslim və başqaları Ammar ibn Yasirdən rəvayət etmişlər.

İndi də Sünnəsiz Quranı anlamağım mümkünsüzlüyünü açıqlayan bəzi ayələri nəzərinizə çatdırırıq.

1 - Uca Allah buyurur: **"İman gətirdikdən sonra imanlarına zülm qatışdırmayanları əmin-amanlıq gözləyir. Doğru yola yönəlmişlər də məhz onlardır."**[3]

O zaman səhabələr ayədə qeyd olunan "zülm" kəlməsini ümumi mənasında, hər bir zülm və kiçicik haqsızlığa belə aid olduğunu zənn

[1] "əl-Maidə", 38
[2] " əl-Maidə", 6
[3] " əl-Ənam",82

etmişdilər. Bu səbəbdən onlar gəlib peyğəmbərdən ﷺ soruşdular ki; Ey Allahın rəsulu! bizlərdən kim imanına zülm qatmır ki? Peyğəmbər ﷺ dedi: "Elə deyil, buradakı zülm sözü şirk mənasındadır. Məgər Loğmanın öz oğluna belə dediyini eşitməmisiniz? : **"Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür!"**[1] Hədisi Buxari, Muslim və başqaları rəvayət etmişlər.

2 – Uca Allah buyurur: **"Yer üzündə səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmanıza görə sizə günah gəlməz. Şübhəsiz ki, kafirlər sizin açıq-aydın düşmənlərinizdir."**[2]

İlk baxışdan ayədən belə anlaşılır ki, səfərdə namazı qısaltmaq üçün qorxunun olması şərtdir. Bəzi səhabələr peyğəmbərdən ﷺ soruşmuşdular ki; bizlər əmin-amanlıqda olduğumuz halda nə üçün namazı qısaldırıq? Peyğəmbər dedi: "Bu Allahın sizlərə bəxş etdiyi bir sədəqədir, elə isə Onun sədəqəsini qəbul edin." Hədisi Muslim rəvayət etmişdir.

3 – Uca Allah buyurur: **"Leş, qan ... sizə haram edildi."**[3]

Sünnə isə bizlərə bəyan etmişdir ki, çəyirtkə ilə balığın leşi, habelə qaraciyərlə dalaq qandan ibarət olmalarına rəğmən halaldırlar. Peyğəmbər demişdir: "İki növ leş və iki növ qan sizlərə halal edilmişdir: çəyirtkə ilə balıq, bir də qaraciyərlə dalaq." Hədisi Beyhəqi və qeyriləri həm peyğəmbərin ﷺ, həm də səhabənin sözü olaraq rəvayət etmişdir. Səhabənin sözü olaraq varid olan rəvayət səhihdir və o peyğəmbərin sözünün hökmündədir. Çünki belə bir məsələ rəylə bildirilə bilməz.

4 – Uca Allah buyurur: **"De: "Mənə gələn vəhylər içərisində ölü heyvan, axar qan, murdar sayılan donuz əti və Allahdan başqasının adı ilə kəsilmiş murdar heyvanlardan başqa, hər hansı bir şəxsin yediyi yeməklər içərisində haram buyurulan bir şey görmürəm"**[4]

Sonradan isə sünnədə bu ayədə qeyd olunmayan bir sıra şeylərin haram olduğunu bildirilmişdir. Misal üçün peyğəmbər ﷺ demişdir:

---

[1] "Loğman", 13
[2] "Ən-Nisa", 101
[3] "əl-Maidə" 3
[4] " əl-Ənam, 145

“Bütün yırtıcı heyvanlar və caynaqlı quşlar haramdır.” Bu barədə bir çox başqa hədislər də vardır. Peyğəmbər Xeybər günü demişdir: “Uca Allah və Onun rəsulu ev eşşəyini[1] sizlərə qadağan edir. Şübhəsiz ki, bu murdardır.” Hədisi Buxari və Muslim rəvayət etmişdir.

5 – Uca Allah buyurur: **“De: “Allahın Öz qulları üçün üzə çıxartdığı zinəti və təmiz ruziləri kim haram etmişdir?”[2]**
Lakin sünnədə isə bəzi zinət növlərinin haram olduğu bildirilir. Bir dəfə peyğəmbər ﷺ səhabələrin yanına gələrək, bir əlində ipək parça, digər əlində isə qızıl tutaraq demişdir: “Bu iki şey ümmətimin kişilərinə haram, qadınlarına isə halal edilmişdir.” Hədisi Hakim səhih olaraq rəvayət etmişdir. Buna oxşar hədislər mötəbər hədis kitablarında çoxdur. Hədis və fiqh elmlərində alimlərə bəlli olan çoxsaylı misallar vardır.

Möhtərəm qardaşlar, bütün bu qeyd etdiklərim İslam şəriətində Sünnənin yerini göstərir. Qeyd olunan və buna bənzər digər misallara nəzər saldıqda əmin oluruq ki, Sünnə olmadan Qurani Kərimi düzgün anlamaq qeyri mümkündür.

Birinci misalda səhabələr ”zülm” kəlməsini yanlış anlamışdılar. Halbuki onlar İbn Abbasın dediyi kimi: “Bu ümmətin ən əfzəlləri, ən saf qəlbli olanları, ən dərin biliklərə malik olanları və ən az mükəlləf olanlarıdırlar.” Buna baxmayaraq onlar həmin sözü yanlış anlamışdılar. Əgər peyğəmbər ﷺ onların səhvlərini düzəldərək ”zülm” sözünün şirk anlamında olduğunu bildirmiş olmasaydı bu gün bizlər onların səhvinə tabe olardıq. Lakin Uca Allah peyğəmbərinin sünnəsi vasitəsilə bizi bu səhvdən qorumuşdur.

İkinci misala gəlincə qeyd olunan hədis olmasaydı ən azı bu gün biz əmin-amanlıqda olan kəsin namazı qısalda bilməsi barədə şübhə içərisində olardıq. Hətta ola bilsin ki, ayənin zahirindən başa düşüldüyü kimi, namazı qısaltmaq üçün qorxunun şərt olduğunu bildirmiş olardıq. Bəzi səhabələr də ayəni məhz elə anlamışdılar. Sonradan onlar peyğəmbərin ﷺ əmin-amanlıq halında namazı qısaltdığını gördülər və ona tabe oldular.

[1] Yəni ev eşşəyinin ətini.
[2] “əl-Əraf”, 32

Üçüncü misala gəlincə əgər hədis olmasaydı Allahın bizlərə halal buyurduğu çəyirtkə, balıq, qaraciyər və dalaq kimi nemətlərdən məhrum olardıq.
Dördüncü misaldakı hədis də bizlərə bəlli olmasaydı, o zaman Uca Allahın peyğəmbərinin dili ilə haram buyurduğu vəhşi heyvanların və caynaqlı quşların ətlərini halal görərdik.
Eləcə də beşinci misaldakı hədisləri bilməsəydik Uca Allahın peyğəmbərinin dili ilə haram buyurduğu qızıl və ipəyi halal görərdik. Buna əsasən bəzi sələflər demişlər: "Sünnə Quranı tamamlayır."

**Quranı götürüb sünnəni tərk edənlərin azğınlıqda olmaları barədə.**

Əfsuslar olsun ki, bəzi müasir yazar və təfsirçilər yalnız Qurana əsaslanaraq qeyd etdiyimiz sonuncu iki misaldakı hədislərdə buyurulan vəhşi heyvanların ətini yeməyi, qızıl və ipək geyməyi halal görmüşlər. İş o yerə gəlib çatıb ki, müasir dövrümüzdə Quranilər adlanan yeni bir firqə də meydana gəlmişdir. Onlar Quranın ayələrini istədikləri kimi açıqlayır və səhih sünnəyə müraciət etmirlər. Onlara görə sünnə artıq bir şeydir. Onlar sünnədəki dəlillərdən özlərinə uyğun olanları qəbul edir, uyğun gəlməyənləri isə rədd edirlər. Sanki peyğəmbər ﷺ hələ o vaxt səhih bir hədisdə onlara işarə edərək buyurmuşdur: "Sizlərdən heç kim taxtının üzərində oturaraq mənim əmr və qadağalarımı eşitdikdə: Bilmirəm! Quranda nə varsa ona tabe olacağıq – deməsin." Hədisi Tirmizi rəvayət etmişdir. Başqa bir rəvayətdə isə belə deyilir: "yalnız Quranda haram buyurulanları haram hesab edərik - deməsin. Şübhəsiz ki, mənə Quran və onun kimisi verilmişdir."
Digər bir rəvayətdə isə deyilir: "Şübhəsiz ki, Rəsulullahın haram buyurduqları Allahın haram buyurduqları kimidir."

Digər təəssüf doğuran amil bəzi möhtərəm yazarların İslam şəriəti və əqidəsi barədə kitab yazaraq, həmin kitabların müqəddiməsində yalnız Qurana əsaslandıqlarını vurğulamalarıdır.
Bu səhih hədis açıq-aydın dəlalət edir ki, İslam şəriəti yalnız Qurandan ibarət deyil, Quran və Sünnədən ibarətdir. Onlardan birini buraxıb digərinə tabe olanlar birinə belə tabe olmuş olmazlar. Çünki onların hər biri digərinə tabe olmağın zəruri olduğunu bildirir. Uca Allah buyurur: **"Kim Peyğəmbərə itaət edərsə, Allaha itaət etmiş olar."**[1]
Həmçinin buyurur: **"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar."**[2]
Həmçinin buyurur: **"Allah və Onun Elçisi bir işə hökm verdiyi zaman heç bir mömin kişi və mömin qadın öz işlərində istədikləri qərarı verə bilməzlər. Allaha və Onun Elçisinə asi olan kəs, əlbəttə ki, açıq-aydın azğınlığa düşmüşdür."**[3]
Başqa bir ayədə buyurur: **"Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi də qadağan edirsə, ondan çəkinin."**[4]
Bu ayə ilə əlaqədar İbn Məsuddan ﵁ rəvayət olunan bir hədis çox xoşuma gəlir. Həmin hədisdə bildirilir ki, bir dəfə bir qadın onun yanına gələrək deyir: Allah qaş alana və aldırana, dəri döydürənə ... lənət eləsin - deyən sənsənmi? İbn Məsud dedi: Bəli. Qadın dedi: Mən Allahın kitabını başdan axıra oxumuşam, lakin sənin dediklrinə rast gəlməmişəm. İbn Məsud dedi: Əgər sən həqiqətən də onu oxumuş olsaydın tapardın. Məgər sən: **"Peyğəmbər sizə nə verirsə, onu götürün, nəyi də qadağan edirsə, ondan çəkinin."**[5] **–** ayəsini oxumamısan? Qadın cavab verdi ki; oxumuşam. İbn Məsud dedi: Mən Rəsulullahın belə dediyini eşitmişəm: "Allah qaş aldırana ... lənət eləsin." Hədisi Buxari və Muslim rəvayət etmişlər.

---
[1] "ən-Nisa", 80
[2] "ən-Nisa", 65
[3] " əl-Əhzab", 36
[4] " əl-Həşr", 7
[5] " əl-Həşr", 7

## Quranı anlamaq üçün dili bilməyin kifayət etməməsi.

Qeyd olunan ayələrdən bəlli olur ki, heç kəs hətta ərəb dili və ədəbiyyatı üzrə alim olsa belə peyğəmbərin ﷺ söz və əməllərindən ibarət olan sünnəsinə müraciət etmədən Qurani Kərimi anlaya bilməz. Çünki həmin alim nə qədər elmli olsa belə səhabələrdən daha elmli ola bilməz. Quran onlara nazil olarkən ərəb dili hələ indi olduğu kimi müxtəlif ləhcələrə bölünməmiş, başqa dillərlə qarışmamışdı. Bütün bunlara baxmayaraq onlar bəzi ayələrdə dilə əsaslandıqları üçün onları yanlış anlamışdılar.

Beləcə aydın olur ki, insan nə qədər sünnəni yaxşı bilsə, bir o qədər Quranı və onun əhkamlarını başqalarına nisbətən daha düzgün anlayar. Belə olduğu halda Sünnəni ümumən qəbul etməyənlər və ona əsaslanmayanlar Quranı necə anlaya bilərlər?!

Elm əhli arasında yekdilliklə qəbul olunan qaydaya əsasən: Quran həm Quranla, həm Sünnə ilə, həm də səhabələrin sözü ilə açıqlanır...[1]

Beləcə ta qədim zamanlardan dövrümüzədək Kəlam alimlərinin həm əqidə, həm də fiqhi məsələlərdə sələfə müxalif olmalarının səbəbi aydın olur. Onlar sünnədən uzaqlaşaraq Allahın sifətləri və digər məsələlərdə öz ağıllarına və nəfslərinin istəklərinə tabe olmuşlar. "Təhavi əqidəsinin şərhi" əsərində[2] bu çox gözəl açıqlanır:

"Dinin əsaslarını Quran  və Sünnəyə əsaslanmadan, kiminsə sözünə əsaslanaraq götürənlər bu barədə necə danışa bilərlər? Beləsi Qurana əsaslandığını iddia etsə belə onun təfsirini peyğəmbərin ﷺ hədislərindən götürmür, nə onun nə də ən xeyirli insanlar olan səhabə və tabiinlərin sözlərinə məhəl qoymur. Halbuki onların ən etibarlı şəxs olduqlarını alimlər bildirmişlər. Onlar yalnız Quranın sözlərini deyil, həm də onun mənasını bizlərə nəql etmişlər. Belə ki, onlar Quranı uşaqların əzbərlədiyindən fərqli olaraq onun mənasını da öyrənmişdilər. Onların yolunu getməyənlər isə öz rəylərini bildirir

---

[1] Bir çox elm əhli arasında yayıldığı kimi demirik ki: Sünnə olmadıqda Quran Quranla açıqlanır, sonra isə Sünnə ilə. Bu məsələni risalənin sonunda Müaz ibn Cəbəlin hədisini qeyd edərkən açıqlayacağıq.

[2] Dördüncü nəşrdə 212-ci səhifə.

və bunu Allahın dini hesab edir. Çünki beləsi doğru desə belə mənbəyə əsaslanmadan bunu söyləyirsə günah qazanmış olur. Əksinə Quran və Sünnəyə əsaslanaraq səhvə yol verən isə əcr qazanmış olur. Doğru dedikdə isə onun əldə etdiyi əcr ikiqat olur."

Sonra da belə demişdir[1]: "Peyğəmbərə tam formada təslim olmaq, onun əmrlərinə tabe olmaq, onun verdiyi xəbərləri qəbul və təsdiq edərək ağlabatan fikir adlandırmaqla öz batil xəyallarımızla ona qarşı çıxmamaq, ona şübhə etməmək, kimlərinsə rəylərini və zehnlərinin tullantılarını onun sözündən üstün tutmamaq, bir sözlə Uca Allahı ibadətdə, qorxuda, zəlillikdə, yönəlməkdə və təvəkküldə təkləşdirdiyimiz kimi, hökm verməkdə, itaət etməkdə və təslim olmaqda da peyğəmbəri ﷺ təkləşdirməliyik."

Xülasə gərək müsəlmanlar Quran və Sünnəni bir birindən ayırmasınlar. Onların hər ikisini götürmək və onların hökmlərinə tabe olmaq vacibdir. Yalnız bu minvalla onlar yollarını azmayaraq zəlalətdan yaxa qurtara bilərlər. Peyğəmbər bu barədə demişdir: "Özümdən sonra sizlərə iki şey qoyub gedirəm, onlara sarıldığınız müddətdə əsla yolunuzu azmazsınız: Allahın kitabı və sünnətim. Bu iki şey mənim hovuzumun kənarına gələnədək birlikdə olacaqlar." Hədisi Malik ayrı-ayrı yerlərdə, Hakim isə həsən isnadla birlikdə rəvayət etmişdir.

**Mühüm qeyd:**

Bütün bu qeyd olunanlardan sonra bildirmək istəyirəm ki; Şəriətimizdə xüsusi yeri olan sünnə deyildikdə müxtəlif təfsir, fiqh, fəzilət və moizə kitablarında yazılan hədislər deyil, peyğəmbərdən ﷺ səhih olaraq nəql olunan, alimlər tərəfindən səhih isnadları və mötəbər raviləri araşdırılaraq sübuta yetirilən hədislər nəzərdə tutulur. Çünki belə kitablarda zəif, münkər və uydurma hədislər çox olur ki, dinimiz İslam bu tip hədislərdən uzaqdadır. Belə hədislərdən Harut və Marutla bağlı olan hədisi, Ğaraniq hədisini[2] misal

[1] 217 – ci səhifə
[2] Bu hədislə bağlı mənim " Nasbul məcəniq fi nəsf qissatul ğaraniq" adlı xüsusi bir risaləm vardır.

göstərmək olar. Zəif və uydurma hədislərin böyük bir hissəsini toplayaraq "Silsilətul əhədisud-daifə val-məudua va əsəruhəs-seyyi fil-ummə" adlı kitab qələmə almışam. İndiyədək təqribən dörd min belə hədis toplamışam.[1] Onların arasında zəif olanı da var, uydurma olanı da.

Gərək insanlara fətva verənlər və onlara şəriət hökmlərini tədris edənlər səhihliyini dəqiqləşdirmədən hədis söyləməsinlər. Elm əhlinin də bildiyi kimi, insanların adətən müraciət etdikləri fiqh kitabları zəif, münkər və əsli olmayan hədislərlə doludur.

Hal-hazırda çox mühüm bir kitab üzərində işləyirəm və hesab edirəm ki, bu kitab fiqh mütəxəssisləri üçün çox faydalı olacaqdır. Həmin kitab belə adlanır: "Əl-əhədisud-daifə val-məudua fi umməhətil-kutub əl-fiqhiyyə"[2]. Fiqh kitabları dedikdə əsasən aşağıdakı kitabları nəzərdə tuturam:

1 – Hənəfi fiqhində əl-Mirğinaninin "əl-Hidayə" əsəri.

2 – Maliki fiqhində İbn Qasimin "əl-Mudavvənə" əsəri.

3 – Şafii fiqhində Rafiinin "Şərhul vaciz" əsəri.

4 – Hənbəli fiqhində İbn Qudəmənin "əl-Muğni" əsəri.

5 – Müqayisəli fiqhdə İbn Rüşd əl-Əndəlosinin "Bidayətul müctəhid" əsəri.

Lakin əfsuslar olsun ki, həmin kitabı bitirmək mənə müyəssər olmamışdır. Belə ki, Küveytin "əl-vayul İslami" jurnalı həmin kitabı nəşr etməyi vəd etsə də, sonradan vədinə xilaf çıxdı.

Artıq bu işin ipini buraxmışam. Ola bilsin ki, başqa bir məclisdə fiqh mütəxəssisləri üçün onlara işlərində yardımçı olacaq bir mövzudan söhbət açım. Həmin mövzuda hansı hədis kitablara müraciət etməyin zəruri olduğunu, habelə həmin kitabların xüsusiyyət və özəlliklərini açıqlayım. Müvəffəqiyyət yalnız Uca Allahdandır.

*****

[1] Artıq belə hədislərin sayı beş min civarındadır.
[2] Yəni fiqh kitablarında qeyd olunmuş zəif və uydurma hədislər.

## Müazdan ﷺ nəql olunan hədisin zəifliyi.

Barəsində söhbət açdığım mövzunu bitirməmişdən öncə əksər Üsul fiqh kitablarında yer almış məşhur bir hədisin zəif olmasını diqqətinizə çatdırmaq istəyirəm. Həmin hədis haqqında danışdığım Quran və Sünnənin ayrılmaz olması və onların hər ikisinə əsaslanmağın vacibliyi məsələsi ilə ziddiyyət təşkil edir. Müaz ibn Cəbəldən ﷺ rəvayət olunan həmin hədisdə bildirilir ki, peyğəmbər ﷺ onu Yəmənə göndərərkən belə demişdir: "Nə ilə hökm verəcəkdən?" Dedi ki: Allahın kitabı ilə. Dedi: "Əgər tapmasan onda necə?" Dedi: Rəsulullahın Sünnəsi ilə. Dedi: "Əgər tapmasan onda necə?" Dedi: onda öz rəyimlə ictihad edərəm. Peyğəmbər dedi:" Rəsulullahın elçisini onun sevdiyi şeyə müvəffəq edən Allaha həmd olsun."

İndi bu hədisin zəifliyini bəyan etmək mümkün deyil. Həmin hədisi mən Zəif və uydurma hədislər silsiləsi əsərində bəlkə də məndən öncə heç kəsin etmədiyi miqdarda bəyan etmişəm.[1]

Təkcə onu demək kifayətdir ki, hədis elmində "Əmirul muminin"[2] hesab olunan İmam Buxari həmin hədisin "Münkər" olduğunu bildirmişdir. Bundan sonra qeyd etdiyim ziddiyyəti açıqlamaq istəyirəm:

Müazın ﷺ hədisi hökm verən hakimə üç mərhələli bir qayda açıqlayır. Sünnəni araşdırmadan ictihad etmək olmaz, Quranı araşdırmadan isə Sünnəyə müraciət etmək olmaz. Bütün alimlər rəy məsələsində bu qaydanın düzgün olduğunu bildirmişlər. Həmçinin onlar bildirmişlər ki; dəlil mövcuddursa, rəy batil olur. Lakin həmin qayda sünnə barəsində doğru deyildir. Çünki Sünnə Quranı açıqlayıb onun barəsində hökm verəndir. Gərək Quranda olması zənn edildikdə belə hər bir hökm Sünnədə aransın. Beləliklə qətiyyətlə bildiririk ki, sünnənin Quranla birlikdə olması, rəyin sünnə ilə birlikdə olması kimi deyil. Əvəzində Quran və sünnəyə vahid

---

[1] "Silsilətul əhədisud-daifə val məuduə" əsəri, 885-ci hədis.
[2] Tərcüməsi möminlərin əmiri deməkdir. Bu ləqəb hər hansı bir elmdə ən güclü hesab edilən alimlərə verilir.

məsdər kimi müraciət olunmalı, aralarında fərq qoyulmamalıdır. Bu barədə peyğəmbər ﷺ demişdir: “Həqiqətən də mənə Quran və onun kimisi verilmişdir.” Yəni sünnə. Həmçinin demişdir: “Bu iki şey (Quran və Sünnə) hovuzumun yanına gələnədək bir-birindən ayrılmayacaqdır.” Buna əsasən də deyə bilərik ki, Quran və sünnə bir-birindən ayrılmamalıdır. Çünki onları ayırmaq qeyd etdiyimiz kimi batildir.
Sizlərlə bölüşmək istədiyim mövzu bu idi. Əgər söylədiklərim doğrudursa, demək bu Allahdandır. Yox əgər haradasa xətaya yol verdimsə deməli bu mənim öz taqsırımdır. Uca Allahdan bizi hər bir xoşagəlməz səhvdən qorumasını diləyirəm. Sonda dua edərək: həmd aləmlərin rəbbi olan Allaha məxsusdur - deyirəm.

# Mündəricat: